UOT 668.652

# İSTEHSAL TEXNOLOGİYASININ YUMŞAQ MEBELLƏRİN İSTEHLAK XASSƏLƏRİN TƏSİRİNİN EKSPERT QİYMƏTLƏNDİRİLMƏSİ

**A. N. YAQUBLU**

**Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)**

*Məqalədə əsasən istehsal texnologiyasının yumşaq mebellərin istehlak xassələrinə təsirinin ekspert qiymətləndirilməsindən bəhs olunur. Məqalədə müasir dövrdə yumşaq mebellərin erqonomikasında və dizaynda baş verən dəyişiklər ətraflı təhlil olunur. Perspektivə yumşaq mebellərin üslublarının dəyişməsilə moda arasında asılıqlar tədqiq olunur.*

***Açar sözlər:*** *istehsal texnologiyası, yumşaq mebellər, istehlak xassələri, ekspert qiymətləndirmə, üslublar, erqonomika, çox funksiyalılıq, penopoliuretan, mikrofibra.*

Hər bir istehlak malının, o cümlədən də yumşaq mebellərin istehlak xassələrini formalaşdıran amillər sırasına onun istehsalına sərf olunan xam material və istehsal texnologiyası aid edilir.

Məqalədə əsasən yumşaq mebellərin istehsal texnologiyasının onun istehlak xassələrinə təsirinin ekspert qiymətləndirilməsi işıqlandırılır. Yumşaq mebel istehsalı üç əsas işdən ibarətdir ki, bunlar xarrat , örtük və bəzək işləridir.

Yumşaq mebellərə üz çəkilməsi işləri yay qoyulmasından və üz materialının çəkilməsindən ibarətdir.

Yay qoyulması yumşaq mebel istehsalında ən məsuliyyətli əməliyyatlardan biridir. Adətən iri məmulatlarda (divan, döşək) yay məftil torun və ya ağaç çərçivənin üzərinə xırda məmulatda(kreslo, stul) qalın parça və ya sıx toxunmuş tesma üzərinə yerləşdirilir.

Yay, məftil tora bağlamaqla, ağaç çərçivəyə metal bəndlərlə, parçaya isə tikməklə möhkəm bərkidilir.

Qoyulmuş yayların başlarını cərgələrin uzununa və eninə, habelə diaqonallar üzrə vintlə bağlıyırlar, beləliklə hər bir yay səkkiz yerdən bağlanmış olur. Vintin uclarını mebelin skeletinə bərkidirlər. Yayların üstünə təlis və ya parasin çəkib, bunları skeletə bərkidilir və yayın yuxarı halqalarına tikirlər. Bu parçanın üstündən də hər hansı bir doldurma materialı döşəyib təzədən parça ilə örtür və ona karkasa bərkidirlər. Bort olması üçün döşənəcəyin kənarlarını sırıyırlar, bundan sora bir lay pambıq qoyur, örtük materialından üz çəkir və onu yaxşı dartib mebelin skeletinə bərkidirlər . Bərk bortla mebeli bu cür hazırlayırlar [1].

“Yumşaq” bortlu mebel hazırladıqda yayların qabaq cərgəsinin sərbəst yerləşməsi üçün skeletin qabaq ağacında yuxarıdan yarıq açırlar. Yayların bu cərgəsini qabaq ağaca sıx qoyur, yan cərgənin yayına bağlıyırlar.

Yumşaq mebellərin son bəzək əməliyyatı üz çəkilməmiş hissələrin üzərindəki xırda nöqsanları düzəltməkdən, onları laklamaqdan, pardaqlamakdan və ya əgər bu işlər görülmüşsə, bunları təzələməkdən ibarətdir.

Yarımyumşaq və yarımbərk mebelin istehsal texnologiyası, yumşaq mebelin istehsal texnologiyası ilə müqayisə edildikdə, burada yay olmaması müşahidə edilir.

Hazırda yumşaq mebellərin doldurucusu kimi penopoiuretandan, qoltuqaltı və söykənəcəklərin içərisi akril fibra ilə doldurulur, akril fibraya çox hallarda quş tükünün suni əvəzedicisi də deyilir, bu material öz həcmini istismar zamanı saxlaya bilir, quş tükü isə istismar zamanı bir yerə toplanır, tütün tüstüsünü və s. qoxuları özünə çəkməklə allergiya törədir [1].

Divan demək olar ki, yumşaq mebellərin əsas nümayəndələrindən biridir.

Divanların bütün növləri bir-birindən tamamilə fərqlənir. Bu divanları bir-birindən fərqləndirən xüsusiyyət, onların açılıb yığılması sayılır. Bu divanlardan bir növü irəliyə çıxan bükülmə, digəri isə orta ox üzərində bükülən, axırıncısı yanlara açılan divan.

Divanların ekspert qiymətləndirilməsi zamanı diqqəti onların üzlük və tikişlərinə vermək lazımdır, ekspertlər çalışmalıdırlar ki, istehsal zamanı bu divanların üzlüyü çıxarıla bilən olsun, bükülmə mexanizmi sadə və istismara davamlı olsun.

Müasir dövrdə divanların erqonomikasında və dizaynda sürətlə dəyişikliklər baş verir. Divanlar yüngüllə.ir, iriləşir, onların istirahət funksiyası daha qabarıq surətdə özünü büruzə verir.

Divanın istirahət zonasına çevrilməsi mütərəqqi texnologiyaya və maya dəyərinin yüksəldilməsinə

səbəb olur. Perspektivdə yumşaq mebellərin yerinə yetirdiyi funksiyada böyük dəyişiklər gözlənilir, bu isə üslub rəqabətinə gətirib çıxarıla bilər. Bu meyllərin əsası istehlakçıların mövqeyi və harmoniya uyğunluğu ilə tamamlanacaqdır [2].

Yumşaq mebellərin perspektivdə üslubları nəinki məhdudlaşacaq, əksinəonlar daha da dəyişən moda ilə ayaqlaşmağa çalışacaqdır.

Hazırda tikilən evlərin interyeri də getdikcə dəyişilir. Bu interyerlər dəyişdikcə mebellərin yerinə yetridiyi funksiyalar da çıxarılır. Mebellərin funksiyalarının çoxalması, evlərin interyerində sahələrin mebelləşdirməsinə şərait yaradır. Ev sahələrinin modelləşdiriməsi isə öz növbəsində interyerlərin bəzi problemlərini həll etməyə imkan verir. Mebellər həm çox funksiyaları yerinə yetirir, həm də açılıb yığılan olduğundan çox az sahəni tutur.

Hazırda bükülmə-açılma mexanizmlərinə malik olan yumşaq mebellər özlərinin erqonomik funksiyalarını daha yaxşı yerinə yetirməyə yaxındırlar, belə ki, divan və kreslolar, hansı ki, daha təkmilləşmiş bükülmə mexanizminə malik olurlar, belə divan və kreslolar, istehlakçının orqanizminin vəziyyətini tənzimləməyə şərait yaradır.

Müasir yumşaq mebellərin txnologiyasında müxtəlif xam materiallardan istifadə edilməsi, onların istehlak xassələrinin yaxşılaşdırılmasına aparan bir yoldur. Yumşaq mebellərin istehsalında istifadə olunan ağac materiallarının teksturasının, təbii və süni gönlərin, plyonkaların, metalların, mərmərin, şüşənin, güzgünün, plastiklərin bir harmoniyada birləşdirilməsi mebelin bədii dəyərini artırır. Yumşaq mebellər binanın, mənzilin interyerinin əsasını təşkil edir. Mebel və interyer, bu iki məvhum və onların ayrı-ayrı elementlərinin göstəriciləri, mütləq mənada vəhdət təşkil etməlidir [2].

İstehsal texnologiyasının yumşaq mebellərin istehlak xassələrinə təsiri ekspertlər tərəfindən qiymətləndirilərkən ən sınanmış və obyektiv nəticələr əldə etməyə imkan verən laboratoriya üsulları sayılır.

Yarımyumşaq və yarımbərk mebelin istehsal texnologiyası, yumşaq mebelin istehsal texnologiyası ilə müqayisə edildikdə, burada yay olmaması müşahidə edilir.

Hazırda yumşaq mebellərin doldurucusu kimi penopoliuretandan, qoltuqaltı və söykənəcəklərin içərisi akril fibra ilə doldurulur, akril fibraya çox hallarda quş tükünün süni əvəzedicisi də deyilir, bu material öz həcmini istismar zamanı saxlaya bilir, quş tükü isə istismar zamanı bir yerə toplanır, tütün tüstüsünü və s. Qoxuları özünə çəkməklə allergiya törədir.

Divan demək olar ki, yumşaq mebellərin əsas nümayəndələrindən biridir.

Divanların bütün növləri bir-birindən tamamilə fərqlənir. Bu divanları bir-birindən fərqləndirən xüsusiyyət, onların açılıb yığılması sayılır. Bu divanlardan bir növü irəliyə çıxan bükülmə, digəri isə orta ox üzərində bükülən, axırıncısı yanlara açılan divan. Divanların ekspert qiymətləndirilməsi zamanı diqqəti onların üzlük və tikişlərinə vermək lazımdır, ekspertlər çalışmalıdırlar ki, istehsal zamanı bu divanların üzlüyü çıxarıla bilən olsun, bükülmə mexanizmi sadə və istismara davamlı olur.

Müasir dövrdə divanların erqonomikasında və dizaynında sürətlə dəyişiklər baş verir. Divanlar yüngülləşir, iriləşir, onların istirahət funksiyası daha qabarıq surətdə özünü büruzə verir [2].

Təbəqənin qalınlığını təyin edərkən mikroskopu tədqiq olunan səthin üzərinə elə qururlar ki, işıq zolağı ağac liflərinə perpendikulyar olsun. Konusvari və silindrik səthlərdə işıq zolağı səth yaradana perpendikulyar olmalıdır. Bu zaman mikroskopun görüş sahəsində iki işıq zolağı – biri aydın təbəqənin səthində və digəri az aydınörtük altında ağacın səthində, əvvəlkindən bir qədər yuxarıda əmələ gəlir. Okulyar mikrometri elə yerləşdirirlər ki, nişanlıyıcı xətlərdən biri mikroskopun işıq xəttinə paralel olsun. Mikrometrin üfüqi xəttini əvvəlcə aşağı işıq zolağının aşağı sərhəddi ilə, sonra isə yuxarı işıq zolağının aşağı sərhəddi ilə uyğunlaşdırırlar, hər iki halda mikrometrin göstəricisini qeyd edirlər. Əgər işıq zolağı düz deyilsə, onda mikrometrin xəttini gözəyarı elə qururlar ki, bu xəttlə işıq zolağının arasında tamamlanan sahələr düz olsun. Oxşar ölçüləri bir-birindən 5-10 mm məsafədə 2-3 yerdə aparırlar. İki ölçüdən alınan miqdar kiçiyindən 10%-dən artıq deyilsə, o təbəqənin orta qalınlığı təyin edilir.

Lak örtüyünün qalınlığının nəticəsi üzrə mebelin bəzəyinin sinfini müəyyən edirlər. I sinif – 180-250 mkm. II sinif – 100-150, III sinif - 60-80 və IV sinif – 30 mkm-ə qədər.

Örtüyün parlaqlığının təyini bu cihazda rəqəmli şkalanın sətirlərindən birinin aydın əksinin qurulmasına əsaslanır.

Örtüyün parlaqlığını təyin etmək üçün ölçüsü 300x150 mm. olan ağac altlıqlı nümunə götürürlər. Örtüyün səthi toz və başqa çirkdən azad olmalıdır. Tədqiq olunan səthə cihazı elə qururlar ki, ağacın quruluşu ikiqat cizgiyə perpendikulyar olsun. Müşaiyəti okulyar vasitəsilə aparırlar. Barabanı tədqiq olunan səthdə rəqəmli şkalanın sətirlərindən birinin dəqiq əksi yaranana qədər fırladırlar, bundan sonra parlaqlıq vahidini müəyyən edirlər [2].

Səthin parlaqlıq dərəcəsi başqa əlamətlərlə yanaşı mebelin şəffaf örtüyünün şəfəqlilik sinfini müəyyən etməkdə istifadə olunur. Belə ki, müəyyən sahəyə aid olan normallığa uyğun olaraq 1-ci sinif üzrə bəzəyi olan mebel 9-cu sətirdən aşağı olmayan

parlaqlığa, 2-ci sinif 7-ci sətirdən, 3-cü üçün 1-cidən aşağı olmayan parlaqlığa malik olmalıdır; yarım-şəfəqli örtük üçün 4-cü sinif üzrə parlaqlıq dərəcəsi təyin olunmur [2].

**ƏDƏBİYYAT**

**1.** Həsənov. Ə. P., Nuriyev. D. Ə., Vəliməmmədov. C. M., Həsənov. N. N., Osmanov. T. R., Babayev M. A., Səmədov. E. Ə. "Qeyri-ərzaq mallarının ekspertizası" Bakı, 2006. **2.** Черепахина А.Н., Эстетика современной мебели, Москва, 2005.

**Экспертное оценивание влияния производственных технологий на потребительские свойства мягкой мебели**

**А. Н. Ягублу**

В данной статье говорится об экспертном оценивании влияния производственных технологий на потребительские свойства мягкой мебели. В статье подробно анализируются происходящие изменения в эргономике и дизайне мягкой мебели в современном периоде. В перспективе исследуется взаимосвязь изменения стиля мягкой мебели с модой.

***Ключевые слова:*** Производственные технологии, мягкая мебель, потребительские свойства, экспертное оценивание, стили, эргономика, многофункциональность, пегополиуретан, микрофибра.

**Expert estimation of consumption property of soft furniture, production technologies**

**A. N. Yagublu**

Expert estimation of consumption property of soft furniture, production technologies is mainly dealt in this article. Changes in ergonomics and design of soft furniture in modern life are widely analyzed in this article. Dependence on methods of soft furniture in perspective and mode are investigated.

***Key words:*** Production technology, soft furniture, consumption properties, expert estimation, methods, ergonomics, multiple function, penopolyuretane, microfiber.

